Hər il bu günlərdə, gənc kişilərin və gənc qızların ən dəyərli təmənnilərini gerçəkləşdirən toylar çoxlu yaşanmaqdadır. İçində şərəfli bir sığınacaq, könül rahatlığı və səadət tapacaqları müsəlman bir ailə yuvası qururlar. Bu yuvanın kölgəsində və qənədləri altında, ciddi bir atalıq və şəfqətli bir analıq ilə bənzərsiz və saleh bir nəsil yetişir. Bəs, bu ailənin xüsusiyyətləri nədir? Üslubu nədir? Səadəti necə gerçəkləşir?! ALLAH ﷻ belə buyurur:

***"Sizin üçün onlarla ünsiyyət edəsiniz deyə, öz cinsinizdən zövcələr xəlq etməsi, aranızda (*dostluq*) sevgi və mərhəmət yaratması da Onun qüdrət əlamətlərindəndir. Həqiqətən, bunda (*bu yaradılışda*) düşünən bir qövm üçün ibrətlər vardır!"***[1]

Ailə yuvası, qiymətini ancaq itirənin, qorxunc bir yalnızlıq içində və həbsxana qaranlı-

[1] ər-Rum surəsi, 30/21.

ğında yaşayanın, yollarda və çöllərdə itənin biləcəyi bir nemətdir.

ALLAH ﷻ belə buyurur:

***"ALLAH evlərinizi sizə məskən*** *(yaşayıb dincəlmə yeri)* ***etdi..."***[2]

İbn Kəsir ؒ belə deyir: "ALLAH ﷻ, qullarına olan nemətinin əksiksizliyini zikr edir. Onlar üçün hüzur və rahatlıq yeri olan yuvalar yaratmışdır. Onlara sığınırlar, onlarda gizlənirlər və onlardan, digər yönlərdən də faydalanırlar."

Müsəlman ailə, ər-arvadın birlikdə daşıdığı bir əmanətdir. Onlar, bu qurumun təməli və dayağıdırlar. Ailə yuvası, onlarla yolunu təyin edər. Onlar; sözdə və davranışda ALLAH`ın ﷻ yolunda doğru getdikdə, gizli və aşkar hallarında təqvaya bürünüb gözəl əxlaq və təmiz bir keçmiş ilə bəzəndikdə, ailə yuvası

---

[2] ən-Nəhl surəsi, 16/80.

nur və fəzilət mənbəyi olar. İnsanların dünyasını işıqlandırar. Saleh bir nəsil yetişdirmək, şərəfli bir cəmiyyət, böyük bir ümmət və yüksək bir sivilizasiya yaratmaq üçün başlanqıcdır.

Ey ər-arvad!.. Ailə yuvanız, bu dinin qalalarından biridir. Sizdən hər biri düşmənlərin daxil olmaması üçün açıq olanı bağlayır. İkiniz də bu qalanın qoruyucularısınız. İdarəni əlində saxlayan ərdir və itaət edilməsi vacibdir. Rəsulullah ﷺ belə buyurur:

*"Hamınız bir çobansınız və hamınız idarəsi altındakilərdən məsuldur."* Sonra belə buyurur: *"Qadın, ərinin evində çobandır və idarəsi altındakindən məsuldur."*[3]

Rəsulullahın ﷺ ailəsi və möminlərin anaları olan xanımları yer üzündəki bütün ailələrə ən gözəl örnəkdir. Rahatlıq və hüzur üzərində qurulmuş, davamlı zikr və Quran tilavəti üzərində bina edilmiş, nəbəvi bir ailə yuva-

---

[3] əl-Buxari.

sıdır. Həyatı üçün açıq ölçülər təyin etmiş, zühd və qənaətdə ən gözəl örnəkləri ortaya qoymuşdur. Rəsulullah ﷺ, xanımlarını örnək bir həyat üçün hazırladıqdan sonra heç bir təsir etmədən onları seçimdə sərbəst etmişdir. Rəsulullahın ﷺ xanımlarının dünya həyatı və bəzəyləri ilə ALLAH ﷻ və Rəsulu ﷺ, axirət yurdu arasında seçim etmələrini istəyən ayə nazil olmuşdur. ALLAH ﷻ belə buyurur:

***"Ya Peyğəmbər! (****Artıq xərclik və pal-paltar istəyən****) zövcələrinə belə de: "Əgər siz dünya həyatını və onun dəbdəbəsini istəyirsinizsə, gəlin sizə talaq haqqınızı verim və (****sonra da****) gözəl bir tərzdə (****ALLAH`ın buyurduğu qayda üzrə****) boşayım! Yox, əgər ALLAH`ı, Onun Rəsulunu və axirət yurdunu istəyirsinizsə, (****bilin ki****) ALLAH içərinizdən yaxşı işlər görənlər üçün böyük bir mükafat (****Cənnət****) hazırlamışdır. (****Peyğəmbər əleyhissəlamın xanımları dünya nemətlərindən vaz keçib axirət yurdunu daha üstün tutdular****)."***[4]

---

[4] əl-Əhzab surəsi, 33/28-29.

Bunun üzərinə Aişə və digər bütün xanımları belə deyir: "ALLAH`ı və Rəsulunu, axirət yurdunu seçirik." Bunun mənası, İslam kasıblığa dəvət edir deyildir. Cənnət də həyatın təmiz yönlərindən faydalanmağa mane olmaz. Əksinə Rəsulullahın ﷺ ailəsi, İslamın yetişdirdiyi ən gözəl örnəkdir.

İslamın ilk nəslinin qurduğu müsəlman ailəsi, sözdə və davranışda İslami üsluba əsaslanmışdır. Həyatını, imanın nuruyla işıqlandırmış və Quranın əxlaqı ilə təchiz etmişdir. Aralarından, tarixin ən parlaq səhifələrini yazan bənzərsiz nümunələr çıxmışdır. Müsəlman ailəsi o dönəmdə cəsur qəhrəmanlar, dəyərli alimlər, zühd əhli olan abidlər, səmimi sərkərdələr, xeyirli övladlar və ibadət əhli qadınlar yetişdirmişdir. İman və hidayət əsasları üzərinə qurulduqda və Quran nuru ilə işıqlandıqda müsəlman ailələri belə olur.

ALLAH`dan ﷻ layiqincə qorxan təmiz bir ailə, fitrəti azğınlıqlardan qoruyur. Rəsulullah ﷺ belə buyurur:

*"Hər doğulan mütləq fitrəti ilə doğulur. Sonra ata-anası onu ya yahudi edir, ya xristiyan edir ya da məcusi edir."*[5]

İbn əl-Qeyyim ﷺ belə deyir: "Uşaqların çoxunun pozulması ataları tərəfindən; onlara diqqətsiz yanaşmaları və onlara dinin fərzlərini və sünnətlərini öyrətməyi tərk etmələri üçün gerçəkləşir. Uşaqlıqlarından onları itirirlər. Onlar da böyüdüklərində nə özlərinə, nə də atalarına faydalı olurlar."

Ailə başçısının uşaqlarını bir araya toplaması və onlara Quran oxuması nə gözəl bir şeydir!. Onlara, peyğəmbərlərin hekayələrini danışar və davranışlarına böyük ədəb qanunları yerləşdirir.

Müsəlman ailəsinin ən mühüm vəzifələrindən biri və cəmiyyətə təqdim etdikləri ən uca mesaj, uşaqların tərbiyəsidir. Güclü və saleh bir nəsil yetişdirməkdir. Ana-atanın gözəl nümunəsi olmadan nəsihətin bir təsiri, tərbiyənin bir dəyəri yoxdur. İbadətdə və əxlaqda

[5] əl-Buxari.

nümunə... Sözlərdə və davranışlarda nümunə... İçdə və görünüşdə nümunə... ALLAH عزوجل belə buyurur:

***"Və o kəslər ki: "Ey RƏBB`imiz, bizə zövcələrimizdən və uşaqlarımızdan*** (*sənə itaət eməklə bizi sevindirib*) ***gözümüzün işığı*** (*bəbəyi*) ***olacaq övladlar ehsan buyur və bizi müttəqilərə imam*** (*rəhbər*) ***et! - deyərlər."***[6]

İbrahimin عليه السلام duasını düşün! O عليه السلام belə demişdi:

***"Ey RƏBB`im! Məni də, nəslimdən olanları da*** (*vaxtlı-vaxtında, lazımınca*) ***namaz qılan et. Ey RƏBB`imiz! Duamı qəbul buyur!"***[7]

ALLAH عزوجل belə buyurur:

***"Əhlinə*** (*əhli-beytə və ümmətinə*) ***namaz qılmağı əmr et, özün də ona*** (*namaza*) ***səbirlə da-***

---

[6] əl-Furqan surəsi, 25/74.
[7] İbrahim surəsi, 14/40.

***vam et** (yaxud məişət çətinliklərinə döz)**. Biz səndən ruzi istəmirik,** (əksinə) **sənə ruzi verən Bizik.** (Gözəl) **aqibət təqva sahiblərinindir** (müttəqilərindir)**!"**[8]

Hüzurlu və doğru yolda olan ailənin yoxluğunda azmalar gerçəkləşir, narkotikdən istifadə və digər çirkin haramlar çoxalır. Uşaqların və gənclərin arasında cinayət hadisələri yüksəlir. Daha da pisi, intihar faizlərinin artdığını eşidirik... Könüllərə iman yerləşdirməyən və Quran yolunda doğru getməyən bir ailə psixolojik, fikri və əxlaqi pozğunluq yaşayan ünsürlər meydana gətirir. Bəzi uşaqlarda gördüyümüz ata-anaya pislik etmə, gənclər arasındakı zərərli əlaqələr, məsuliyyətdən qaçma, ALLAH`dan ﷻ üz çevirmə və bu gün ümmətin övladlarından bəzilərini bürüyən, əsaslara və dəyərlərə qarşı çıxması, tərbiyəyə diqqətsiz yanaşan və uşaqlarına gözəl örnək ola bilməyən bir ailənin nəticəsidir.

---

[8] Ta Ha surəsi, 20/132.

İslamın qanunlarını bölən, xoşuna gələni alan və istəmədiyini tərk edən bir ailə, alçaq insan nümunələri və pozğun insanlar yetişdirər. Bunlar, ümmətin izzət və liderlik mövgeyinə yüksəlməsində faydalı ola bilməzlər.

Müsəlman ailənin əsas xüsusiyyətlərindən biri də, hər anlaşmazlıqda, nə qədər kiçik olursa olsun hər hadisədə, işini ALLAH`a عز وجل və Rəsuluna ﷺ həvalə etməsidir. Ailədəki hər kəs, ALLAH`ın عز وجل hökmünə razı və təslim olur. ALLAH عز وجل belə buyurur:

***"ALLAH və Peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək** (*öz ixtiyarları ilə ayrı cür hərəkət etmək*) **yaraşmaz..."***[9]

Müsəlman ailənin həyatı və səadəti, hüzuru və rahatlığı ALLAH`ı عز وجل zikr etməkdədir. Əbu Musa رضي الله عنه Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

---

[9] əl-Əhzab surəsi, 33/36.

*"İçində ALLAH`ın zikr edildiyi ev ilə içində ALLAH`ın zikr edilmədiyi evin misalı, ölü ilə dirinin misalıdır."*[10]

İbn Ömər رضي الله عنه Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Namazlarınızdan (nafilə namazlarından) bir qismini evlərinizdə qılın. Evlərinizi qəbirlərə çevirməyin."*[11]

Əbu Hureyrə رضي الله عنه Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Evlərinizi qəbirlərə çevirməyin. Şübhəsiz şeytan, Bəqərə surəsi oxunan evdən qaçır."*[12]

Zeyd ibn Sabit رضي الله عنه Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

---

[10] Muslim.
[11] əl-Buxari. Muslim.
[12] Muslim.

*"Evlərinizdə namaz qılın! Çünki fərz namazları xaric, insanın qıldığı ən xeyirli namaz evində qıldığıdır."*[13]

Bu hədislər, müsəlmanların evlərinin ihyasına; kəlməyi tövhidlə, təsbihlə, təkbirlə və buna bənzər zikrlərlə ALLAH`ı ﷻ anaraq onları nurlandırmağa; çoxlu nafilə namazı qılaraq onları canlandırmağa işarə edir. Evlər namazdan və zikrdən uzaq olarsa, yüksək saraylar belə olsa cansız qəbirlərə və xarabalara dönər. ALLAH`ın ﷻ zikri edilməyən və Quran oxunmayan evlər, şeytanların meydanıdır. O evlərdə yaşayanların bədənləri diri olsa da qəlbləri ölüdür.

Müsəlman ailəsinin bir xüsusiyyəti də, fərdlərinin ibadət və itaətdə yardımlaşmasıdır. Ərin zəif imanını arvadı gücləndirər. Qadının davranış səhvlərini əri düzəldər. Bir-birini tamamlayar və dəstəkləyərlər. Bir-birinə nəsihət və yardım edərlər. Aişə رضي الله عنها belə deyir: "Rəsu-

---

[13] əl-Buxari. Muslim.

lullah ﷺ gecənin bir qismində namaz qılardı. Vitr namazını qıldığı zaman:

*"Qalx və vitri qıl ey Aişə!"* buyurardı."[14]

Rəsulullah ﷺ belə buyurur:

*"Gecənin bir qismində qalxıb namaz qılan, xanımını oyadan və o da namaz qılan, rədd edərsə üzünə su sərpən adama ALLAH rəhmət etsin!.. Gecənin bir qismində qalxıb namaz qılan, ərini oyadan və o da namaz qılan, rədd edərsə üzünə su sərpən qadına ALLAH rəhmət etsin!.."*[15]

Bu iki hədis, kişi və qadından hər birinin digərini islah etmədə və ALLAH`a ﷻ ibadətə həvəsləndirmədə rolu olduğuna işarə edir. Bu belədir; çünki aralarındakı əlaqə əslində iman əlaqəsidir. Bu əlaqədə əllər, ALLAH`a ﷻ itaət üçün bir-birini tutar. Bir əl yorularsa, digəri ona yardım edər.

---

[14] Muslim.
[15] Əbu Davud.

Müsəlman ailə, elm və əməl üzərində qurulur. Doğru yola yönləndirən və cəhənnəmə aparan yolları göstərən; təharət ədəbini, namaz əhkamını, izin istəmə qaydalarını, halal və haramı açıqlayan bir bilgi üzərində qurulur. Ailə fərdləri dinin hökmləri haqqında elmsiz olmaz. Bəzən elm məclislərindən şəriət elmini öyrənər. ALLAH ﷻ belə buyurur:

***"Ey iman gətirənlər! Özünüzü və ailənizi oddan qoruyun..."***[16]

Bu ayə, ailə fərdlərini tərbiyə edib öyrətmədə, onlara yaxşılığı əmr edib onları pislikdən çəkindirmədə əsasdır. Təfsir alimləri belə deyir: "Ailəsini bilgiləndirməsi müsəlmanın üzərində bir haqdır." Əli رضي الله عنه belə deyir: "Onlara öyrədin və onları tərbiyə edin!" əl-Qurtubi رحمه الله də belə deyir: "Uşaqlarımıza və ailələrimizə dini və xeyri, əsas ədəb qanunlarını öyrətməliyik."

---

[16] ət-Təhrim surəsi, 66/6.

Müsəlman ailənin bir xüsusiyyəti də həyadır. Həya ilə ailə; varlığını, suiqəsd oxlarından və ölkələri tərk edilmiş ərazilərə çevirən şərr vasitələrindən qoruyur. Həya pərdəsinin açılması; açıq-saçıq filmlər və musiqilərlə və ya örtünməyi tərk etməklə və din düşmənlərinə bənzəməklə havasının kirlənməsi təqva üzərində qurulmuş bir ailəyə yaraşmaz! Bütün bunlar, müsəlman ailənin mənliyini qurd kimi qəmirir. Emar edilmiş yeri xarabaya çevirir.

Müsəlman ailənin bir xüsusiyyəti də, sirlərinin qorunmuş və ailə içi anlaşmazlıqların gizlənmiş olmasıdır. Ailə içində yaşananlar yayılmaz və araşdırılmaz. Əbu Sə`id əl-Xudri رضي الله عنه Rəsulullahın ﷺ belə buyurduğunu rəvayət edir:

*"Qiyamət günü ALLAH qatında insanların ən pis məqamlarından biri, arvadına yaxınlaşan və (arvadı) da ona yaxınlaşan, sonra onun sirrini yayan adamdır."*[17]

---

[17] Muslim.

Müsəlman ailə cəmiyyətlə əlaqəsini iman əsası üzərində qurar. Doğru insanların ziyarəti ilə nuru artar. Mömin, ətir daşıyan insan kimidir. Ya sənə ondan verir, ya ondan o ətri alarsan ya da onun yanında gözəl bir iy taparsan. ALLAH ﷻ belə buyurur:

***"Ey RƏBB`im! Məni, ata-anamı, mənim evimə (****yaxud məscidimə****) mömin kimi daxil olan kimsəni və (****Qiyamət gününə qədər olacaq****) bütün mömin kişiləri və qadınları bağışla. Zalımların isə ancaq və ancaq həlakını (****ölümünü****) artır!"***[18]

Dinindən razı olunmayan şəxs müsəlman ailəyə buraxılmamalıdır. Pislik edənin içəri daxil olması şərdir. Şübhəli insanın evə daxil olması, ürəklərin bir parçası olan uşaqlar üçün təhlükədir. Evlərdə əxlaqlar onlarla pozulmuş və sehr onlarla yayılmışdır. Oğurluqlar ortaya çıxmışdır. Sevinc, kədərə dönmüşdür. Daha da pisi onlar, xoşbəxt ailə üçün dağıdıcı ünsürlərdir.

---

[18] Nuh surəsi, 71/28.

Müsəlman ailənin əlaqəsi, ev işlərində və ailə içi vəzifələrdə yardımlaşma anlayışını canlandıraraq dərinləşir və güclənir. Bu haqda Rəsulullah ﷺ bizim üçün ən gözəl nümunədir. Aişə رضي الله عنها Rəsulullahın ﷺ evdə nə etdiyi haqda soruşulduqda belə cavab verir: "Bəşərdən bir bəşərdi; paltarını təmizləyər, qoyununu sağar, öz işini görərdi."[19] Bir rəvayətdə də belə deyir: "Ailəsinin xidmətində olurdu. Namaz vaxtı gəldikdə namaza gedərdi."[20]

Bizdən birindən dünyada bir arzu etməsi istənsə, ən böyük istəyi və arzusu ailəsinin hər tərəfini əhatə edən bir səadətin kölgəsində yaşamaq olar. Müsəlman ailədə bu səadət, gözəl evlərin, bahalı əşya və paltarların olması ilə gerçəkləşməz!.. Bu yanlış bir səadət anlayışıdır!.. Səadət ancaq, ər-arvaddan hər birinin ALLAH`dan ﷻ layiqincə qorxması ilə, gizli və aşkar hallarında Ona ﷻ itaət etməsi ilə gerçəkləşir. Ər-arvad, ayrı-ayrılıqda evlilik vəzifələ-

[19] Əhməd ibn Hənbəl.
[20] əl-Buxari.

rini səmimiyyətlə və gözəl bir şəkildə yerinə yetirdikləri zaman, buna onları ALLAH`a ﷻ yaxınlaşdıran bir ibadət gözü ilə baxmalıdırlar. Bu anlayış kölgəsində xoşbəxt bir müsəlman ailəsi qurulur. Bu yuva, namaz və Quran ilə vəzifəlidir. Sevgi və anlayış onu kölgələyər. Saleh nəsillər yetişir və ata-ananın gözünü işıqlandırır. Dünyada və axirətdə onlar üçün xeyir mənbəyi olur. ALLAH ﷻ belə buyurur:

***"Mömin olub yaxşı işlər görən (****ALLAH`a itaət edən****) kişi və qadına (****dünyada və axirətdə****) xoş həyat nəsib edəcək və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik."***[21]

***Abdu`l-BARİ əs-SUBEYTİ***
***12/07/2002 Miladi***

[21] ən-Nəhl surəsi, 16/97.